

## AZƏRBAYCAN RESPUBLİKASININ DÖVLƏT HİMNİ

**Azərbaycan! Azərbaycan!**
**Ey qəhrəman övladın şanlı Vətəni!**
**Səndən ötrü can verməyə cümlə hazırız!**
**Səndən ötrü qan tökməyə cümlə qadiriz!**
**Üçrəngli bayrağınla məsud yaşa!**

**Minlərlə can qurban oldu!**
**Sinən hərbə meydan oldu!**
**Hüququndan keçən əsgər,**
**Hərə bir qəhrəman oldu!**

**Sən olasan gülüstan,**
**Sənə hər an can qurban!**
**Sənə min bir məhəbbət**
**Sinəmdə tutmuş məkan!**

**Namusunu hifz etməyə,**
**Bayrağını yüksəltməyə**
**Cümlə gənclər müştaqdır!**
**Şanlı Vətən! Şanlı Vətən!**
**Azərbaycan! Azərbaycan!**

Sözləri *Əhməd Cavadın,*
musiqisi *Üzeyir Hacıbəylinindir.*




**Zahid QARALOV**
**Əlövsət OSMANLI**
**Fikrət SÜLEYMANOĞLU**
**Vüqar MƏMMƏDOV**


# HƏYAT BİLGİSİ

## 1-ci sinif


Azərbaycan Respublikası Təhsil Nazirliyi tərəfindən təsdiq olunub (06.07.2004-cü il tarixli 611 №-li əmr).


*Sinif* ____________________
*Soyadı* ____________________
*Adı* ____________________


BAKI—2006

*Redaktor*: Pedaqoji elmlər doktoru, professor **Y.Kərimov**

*Rəyçilər*: Texnika elmləri doktoru, professor **A.Mehrabov**
Psixologiya elmləri doktoru, professor **Ə.Əlizadə**
Pedaqoji elmlər doktoru, professor **Ə.Ağayev**
Pedaqoji elmlər doktoru, professor **Ə.Hüseynov**
**A.İbrahimova**
(*Bakı şəhəri S.C.Pişəvəri adına Humanitar Gimnaziyanın müəllimi*)
**S.Qulubəyova**
(*Bakı şəhəri 272 №-li məktəbin müəllimi*)



Qaralov Z., Osmanlı Ə., Süleymanoğlu F., Məmmədov V. **Həyat bilgisi** (*1-ci sinif üçün*). —Bakı: **Osmanlı Yayınları**, 2006. —104 səh.

Q $\frac{4306020000-009}{2006}$





***Övladlarını sağlam, bilikli və tərbiyəli böyütmək ailənin və dövlətin birinci dərəcəli işidir.***

**Heydər ƏLİYEV**

## ƏZİZ MÜƏLLİMLƏR!

Bildiyiniz kimi, «Həyat bilgisi» fənni indiyədək «Ana dili»nin içərisində tədris olunurdu. Bu ildən başlayaraq, həmin fənn həftədə 1 saat olmaqla ayrıca tədris ediləcək. «Həyat bilgisi» fənninin əsas məqsədi təlimin birinci pilləsində şagirdlərə yaşadıqları sosial və bioloji mühitlə bağlı ilkin anlayışlar verməkdir. Onların şüurunda əhatə olunduqları canlı və cansız aləmin vahid, bütöv və bölünməz obrazını yaradır. Həyatda zəruri olan davranış qaydalarını öyrədir. Yaşadıqları kəndə, şəhərə, doğma Vətənə, onun rəmzlərinə, təbiətinə, əhatəsində olduğu insanlara məhəbbət hissləri formalaşdırır.

«Həyat bilgisi–1» dərsliyi üzrə aparılan işin daha səmərəli olması üçün aşağıdakı məqamlar diqqət mərkəzində s a x l a n m a l ı d ı r:

**1.** Şagirdlər oxu vərdişlərinə tam yiyələnmədiklərinə görə mətnlər, çalışmalar, suallar, göstərişlər müəllim tərəfindən oxunmalı və izah edilməlidir.

**2.** * işarəsi ilə fərqləndirilən dərslərin çətinlik dərəcəsi yüksək olduğundan, müəllim onların tədrisi zamanı öyrədilən biliklərə sinfin səviyyəsinə uyğun korrektələr etməkdə müstəqildir.

**3.** Təbiət və təbiət hadisələri üzərində müşahidələr aparmaq məqsədilə müəllim bəzi dərslərin materialları əsasında yerli şəraitə uyğun sinifdənxaric işlər təşkil edə bilər.

**4.** Çalışmalar dərsin sonunda müəllimin nəzarəti altında yerinə yetirilir. Bunun üçün lazım olan vaxt müəllim tərəfindən müəyyən edilir. Bəzi çalışmaların düzgün cavabını göstərmək üçün uyğun xananın içərisində sadəcə olaraq «×» işarəsinin qoyulması kifayətdir. Məsələn, **«Şəkildə gördüklərinizdən hansı toyuğun balasıdır!»** sualının cavabı aşağıdakı kimi göstərilir.



☐ ☐ ☒

**5.** Həyat haqqında bilgilərin öyrədilməsi fasiləsiz olduğundan, bu proses təkcə dərslə məhdudlaşmır. Bu işdə valideynlərin üzərinə də böyük məsuliyyət düşür. Yüksək nəticənin əldə edilməsi üçün müəllim hər bir valideynlə ayrıca iş aparmalı, onların nələrə daha çox diqqət yetirməli olduqları haqqında tövsiyələr verməlidir.

**6.** Dərs ili başa çatdıqdan sonra şagirdlər yay tətilində «Həyat bilgisi»ndən oxu materialı kimi istifadə edə bilərlər.

***Müəlliflər***



# MƏKTƏBƏ BAŞLARKƏN



*1-ci dərs*

# Bilik günü. Məktəblə tanışlıq.




**A** Mənim adım Azər, soyadım Əhmədli, atamın adı Adildir. Altı yaşım var. Bu gün Bilik günüdür. İlk dəfə məktəbə gəlmişəm. Burada bizə oxumağı, yazmağı, şəkil çəkməyi öyrədəcək, bilik verəcəklər.

Məktəbin həyətində əllərində gül-çiçək tutmuş çoxlu şagird var. Dövlət himni səslənir. Mən də əlimi ürəyimin üstünə qoyub hamı ilə birlikdə himnimizi oxuyuram. Sonra məktəbin direktoru, müəllimlər bizə «Xoş gəlmişsiniz!» deyir və biz içəri daxil oluruq.

**!** ***Yadda saxlayın*** *Bilikli adam Vətəni üçün daha xeyirli olur.*




Müəllimlər otağı


Kitabxana


İdman zalı


Dəhliz


Əl-üz yuyulan yer

**B.** Məktəbimiz ikimərtəbəlidir. Birinci mərtəbədə müəllimlər otağı, kitabxana və idman zalı var. Sinfimiz «1 A»dır. Sinif otağımız ikinci mərtəbədə yerləşir. Dəhlizin başında əl-üz yumaq üçün yer var.

**?**

*1. Sinif otağınız neçənci mərtəbədə yerləşir?*
*2. Müəllimlər otağı harada yerləşir?*
*3. Kitabxana nə üçündür?*




**C** Sinfimiz geniş və işıqlıdır. Onun iki pəncərəsi var. Divardan bayrağımız, gerbimiz, himnimiz, xəritəmiz və yazı taxtası asılıb. Sol küncdə şkaf, sağ küncdə isə zibil qutusu var. Müəllimimiz stolun arxasında, biz isə partada əyləşirik.




Dərs vəsaitləri və ləvazimatları





**Ç** Müəllimimizin adı Sonadır. Parta yoldaşım Zöhrədir. Bizdən qabaqdakı partada Orxan və Lalə oturur.

Zəng çalınır. Müəllimimiz sinfə daxil olub bizimlə salamlaşır. Onun göstərişi ilə kitab, dəftər və qələmimizi partanın üstünə qoyuruq. Dərs başlanır.

Dərs başlananda və qurtaranda zəng çalınır. Dərslər arasında tənəffüs olur. Tənəffüsdə su içir, yeyir, uşaqlarla söhbət edirik. Sonuncu dərsdən sonra evimizə qayıdırıq.

Həftədə beş gün dərsimiz olacaq. Şənbə və bazar günləri istirahət edəcəyik.



Tənəffüsdə



Tənəffüsdə

**?**

*1. Müəlliminizin adı nədir?*
*2. Parta yoldaşınızın adı nədir?*
*3. Hər gün neçə dərsiniz olur?*

## ÇALIŞMALAR

**1.** Aşağıdakılardan hansı sinif otağınızda **yoxdur**?





**2.** Sinifdə zibili hara atırsınız?





**3.** Dərs ləvazimatları olan şəkli göstərin.







*2-ci dərs*

# Məktəbə getmək, məktəbdən qayıtmaq.




**A** Məktəbə gecikməmək üçün vaxtında yatır, vaxtında oyanıram. Yatmazdan əvvəl kitablarımı, dərs ləvazimatını çantama yığıram. Valideynlərimə və bacıma «Gecəniz xeyrə qalsın!» deyib, yatağıma uzanıram. Səhər yerimdən duranda hamıya «Sabahınız xeyir!» deyirəm. Yatağımı düzəldir, idman edir, dişlərimi fırçalayır, əl-üzümü yuyuram. Yeməyimi yedikdən sonra paltarımı geyinib məktəbə yollanıram.

**!** ***Yadda saxlayın*** *Axşam yatmazdan əvvəl ailə üzvləri ilə sağollaşmaq, səhər yerindən duranda isə salamlaşmaq lazımdır!*





**B** Məktəbə anamla, yaxud atamla gedirəm. Küçədə səki ilə hərəkət edirik. Yolu keçərkən diqqətli olur, svetoforun işığına baxırıq. Yaşıl işıq yananda yolu keçirik. Məktəbə çatanda müəllim və yoldaşlarımla salamlaşıram. Zəng vurulur. Keçib yerimdə əyləşirəm.



Sonuncu zəngdən sonra dərs ləvazimatını çantama yığıram. Müəllim və sinif yoldaşlarımla sağollaşıram. Anamla evə qayıdıram. Əl-üzümü yuyub nahar edirəm. Bir az dincəldikdən sonra həyətə çıxıb qonşu uşaqları ilə oynayıram.




**?**

*1. Küçədə hərəkət edərkən nəyə görə səki ilə gedirsiniz?*
*2. Yoldaşlarınızla necə salamlaşırsınız?*
*3. Svetoforun hər bir işığı nəyi göstərir?*



## ÇALIŞMALAR

**1.** Axşam yatmazdan əvvəl dərs ləvazimatlarınızı hansına yığırsınız?





**2.** Səhər aşağıdakılardan hansının səsinə yerinizdən durursunuz?





**3.** Svetoforların hansında «Dayan!» işığı yanır?





*3-cü dərs*

# Məktəbdə davranış qaydaları.

**A** Məktəbimizdə çoxlu şagird və müəllim var. Müəllimlər şagirdlərə bilik öyrədirlər. Burada xidmətçilər, kitabxanaçılar, fəhlələr də çalışırlar. Bu qədər adamın toplaşdığı yerdə hamının nizam-intizamlı olması, öz işini yaxşı yerinə yetirməsi üçün rəhbər olmalıdır. Məktəbimizə direktor rəhbərlik edir. Onun adı Ədalət müəllimdir. İşi çox olduğuna görə ona müavinləri kömək edirlər. Direktorun kabineti birinci mərtəbədədir.



**B** Məktəbin, eləcə də sinfimizin qapısından içəri keçəndə növbəni gözləyirəm. Dərs zamanı bir söz demək istəsəm, əlimi qaldırıram. Müəllim icazə verdikdən sonra ayağa durub sözümü deyirəm. Dərsdə yoldaşlarımla söhbət eləmirəm. Danışan yoldaşımın sözünü kəsmirəm. Yanlış bir iş tutduqda üzr istəyirəm. Yoldaşlarımın səhvinə və xətalı davranışlarına anlayışla yanaşıram. Axı, mən özüm də nə vaxtsa belə səhv edə bilərəm!







**C** Məktəbimizin və onun həyətinin təmizlik işlərini xidmətçilər yerinə yetirir. Biz onların əməyinə hörmətlə yanaşır, məktəbimizi təmiz saxlayır, lazımsız şeyləri zibil qutusuna atırıq.

Tənəffüs zamanı sinifdə və dəhlizdə qaçmır, səs-küy salmırıq.





**?**

*1. Müəlliminiz və sinif yoldaşlarınızla necə sağollaşırsınız?*
*2. Məktəbdən kiminlə qayıdırsınız?*
*3. Yanlış iş tutduqda nə edirsiniz?*

## ÇALIŞMALAR

**1.** Dərslərinizi harada keçirsiniz?





**2.** Məktəbə kim rəhbərlik edir?





**3.** Məktəbin təmizlik işlərini kim görür?







# *4-cü dərs* Bədənimiz. Sağlamlığımız.

**A** Bədənimiz üç hissədən ibarətdir: baş, gövdə və ətraflar. Başımızda gözlərimiz, qulaqlarımız, ağzımız və burnumuz var. Ətraflar dedikdə qollar və qıçlar başa düşülür. Qolumuzda dirsəyimiz, biləyimiz, əlimiz; qıçımızda dizimiz, topuğumuz, ayağımız var.




**!** **Yadda saxlayın**

*Gözlərimizlə görür, qulaqlarımızla eşidir, burnumuzla qoxu, dilimizlə dad bilir, dərimizlə toxunmanı hiss edirik.*

**B** Sağlam olmaq — xəstələnməmək, gümrah, çevik və güclü olmaq deməkdir. Sağlamlığı qorumaq üçün təmizkar olmalı, idmanı sevməli, vaxtında yatıb-durmalıyıq. Mən hər səhər yerimdən duranda idman edir, axşamlar yatmazdan qabaq ayaqlarımı sərin su ilə yuyuram. Pəncərəni açıb otağımın havasını dəyişirəm. Televizora baxarkən ona çox yaxın oturmuram, musiqiyə qulaq asarkən səsi yüksəltmirəm.





**C** İşlərin çoxunu əllərimizlə gördüyümüzdən onlar tez-tez çirklənir. Ona görə də əllərimi sabunla yuyuram.

Uzun dırnaqlar mikrob yuvası olduğuna görə həftədə bir dəfə əl və ayaq dırnaqlarımı tutdururam. Bədənimi təmiz saxlamaq üçün tez-tez çimirəm. Təmiz və ütülənmiş paltar geyinirəm.

Çaydan, göldən, arxdan su içmirəm. Yuyulmamış meyvə, tərəvəz yemirəm. Çirkli və zibilli yerlərdə oynamıram.

**?**

*1. Niyə əllərimizi sabunla yuyuruq?*
*2. Nəyə görə dırnaqlarımızı tutdururuq?*
*3. Meyvə-tərəvəzi yumamış yesək nə baş verər?*







**Ç** Yoluxucu xəstəliklərdən qorunmaq üçün həkimlər uşaqlara peyvənd edirlər. Üç cür peyvənd edilir: iynə vurmaqla, dərini azca cızmaqla, ağıza dərman damcısı tökməklə. Mən peyvənddən qorxmuram. Xəstələndikdə həkimin məsləhətlərinə qulaq asıram. Vaxtlı-vaxtında dərman içirəm. Qrip olduqda evdəkiləri yoluxdurmamaq üçün onların əşyalarına toxunmuram, ayrıca qab-qacaqdan istifadə edirəm.





**?**

*1. Peyvənd nə üçündür?*
*2. Xəstələnəndə kimə müraciət edirsiniz?*
*3. Dərmanlar haradan alınır?*

## ÇALIŞMALAR

**1.** Kim düzgün **əyləşməyib?**



**2.** Aşağıdakılardan hansı yay geyimidir?

  

**3.** Diş fırçasını xoşunuz gələn rəngdə rəngləyin.





| 5-ci dərs | Sinif nümayəndəsinin seçilməsi.* |
|---|---|

**A** Müəllimimiz özü ilə seçki qutusu, şagirdlərin sayı qədər zərf və ağ vərəq gətirib dedi: «Uşaqlar, artıq bir-birinizi yaxşı tanıyırsınız. Ona görə də özünüzə sinif nümayəndəsi seçə bilərsiniz. Bu vəzifəyə layiq bildiyiniz yoldaşlarınızın namizədliyini verin». Adil Nərgizin, Valeh Anarın, parta yoldaşım Zöhrə isə mənim namizədliyimi verdi. Sona müəllim Nərgizin yaxasına qırmızı, Anarın yaxasına göy, mənim yaxama isə yaşıl nişan taxıb dedi: «Hər kəs tərəfdarı olduğu yoldaşının nişanının rəngini vərəqə gizlicə qeyd edib, zərfə qoysun». Hamımız müəllimimiz deyən kimi edib, sıra ilə zərfləri seçki qutusuna atdıq.




***Sinif nümayəndəsi:***

*— sinifdə nizam-intizamın, təmizliyin saxlanılmasına rəhbərlik edir;*

*— şagirdlərin arzu və istəklərini müəllimə, müəllimin sözlərini isə şagirdlərə çatdırır;*

*— müəllim olmadıqda sinifdə sakitliyi təmin edir;*

*— sözə baxmayan, şuluqluq edən uşaqlara xəbərdarlıq edir, sözə baxmasa, müəllimə bu haqda məlumat verir.*

**B** Müəllim qutunu açdı. Zərflərdəki vərəqləri çıxarıb, rənglərə görə ayırdı. Yaşıl rənglə işarə edilmiş vərəqlərin sayı daha çox oldu. Beləliklə, mən sinif nümayəndəsi seçildim. Məni birinci Nərgizlə Anar, sonra qalan yoldaşlarım təbrik etdilər. Onların hamısına təşəkkür elədim.








**C** Sona müəllim dedi: «Azər, indi özünə təmizlik üzrə köməkçi və hər gün üçün iki sinif növbətçisi təyin etməlisən».

Mən Nərgizi özümə köməkçi təyin etdim. O, sinfimizin təmizlik işlərinə nəzarət edəcək. Növbətçilər isə sıra ilə hər gün sinfin havasını dəyişəcək, əşyaları qoruyacaq, səliqə-sahman yaradacaqlar.







## ÇALIŞMALAR

**1.** Sinif nümayəndəsini kim seçir?

 ☐

 ☐

 ☐

**2.** Sinif nümayəndəsini seçərkən seçki vərəqini aşağıdakılardan hansına atmaq lazımdır?

 ☐



☐

 ☐

**3.** Sinif növbətçisi qoluna aşağıdakılardan hansını bağlayır?



☐

 ☐

 ☐

6-cı dərs

# Mən və biz.


Anam və atam


Babam, nənəm, bacım və mən

**A** Ailəmiz altı nəfərdən ibarətdir: babam, nənəm, atam, anam, bacım və mən. Babam və nənəm təqaüdçüdürlər. Atam təyyarəçidir. O, Azərbaycan Milli Ordusunda xidmət edir. Anam müəllimdir, məktəbimizdə işləyir. Bacım Aytən üçüncü sinifdə oxuyur. O, dərs əlaçısıdır.

Biz mehriban ailəyik. Ev işlərində hamımız bir-birimizə kömək edirik. Babam deyir ki, mehribanlıq olan yerdə xeyir-bərəkət olar.

**?**

*1. Ailənizdə kimlər var?*
*2. Valideynləriniz harada işləyirlər?*
*3. Soyadınız necə əmələ gəlib?*





**B** Biz Bakıda yaşayırıq. Dördotaqlı mənzilimiz beşmərtəbəli evin üçüncü mərtəbəsində yerləşir. Otaqlardan biri qonaq otağıdır. Evimizə qonaq gələndə «Xoş gəldiniz!» deyib, onları qonaq otağına dəvət edirik. Otaqlardan ikisi yataq otağıdır. Birində isə bacımla mən dərslərimizə hazırlaşırıq. Ayrıca mətbəximiz və hamamımız var. Nənəm çox vaxt mətbəxdə olur. Bizə dadlı yeməklər bişirir. Yeməyimizi yedikdən sonra ona «Çox sağ ol!» deyirik. Nənəmsə bizə «Nuş olsun!» deyir.

**?**

*1. Qonaq qarşılayanda nə deyirsiniz?*
*2. Yeməkdən sonra minnətdarlığınızı necə bildirirsiniz?*
*3. Evdə ananıza hansı işlərdə kömək edirsiniz?*



**C** Mənim çoxlu qohumlarım var. Atamın qardaşı əmim, bacısı bibimdir. Anamın qardaşı dayım, bacısı isə xalamdır. Əmim və bibim Gəncədə, dayım və xalam Sumqayıtda yaşayırlar. Mən tez-tez əmim uşaqları və xalam uşaqları ilə telefonla danışıram. Bibim oğlu Kamran universitetdə oxuyur. Bazar günləri gəlib məni gəzməyə aparır. Mənim başqa qohumlarım da var. Onlarla da əlaqə saxlayırıq. Nənəm deyir ki, qohumlar gərək yaxşı gündə də, pis gündə də bir yerdə olsunlar.

**?**

*1. Atanızın bacısı nəyinizdir?*
*2. Ananızın qardaşı nəyinizdir?*
*3. Ananızın bacısı qızı nəyinizdir?*



**Ç** Bizim çoxlu qonşularımız var. Havalar yaxşı olanda böyüklər həyətdə oturub söhbət edir, biz isə oynayırıq. Ən çox üzbəüz qonşumuz Nailə xalagillə dostluq edirik. O da müəllimdir. Anamla bir yerdə işləyir. Nailə xalanın həyat yoldaşı mühəndisdir. Onların oğlu Elgün mənim ən yaxın dostumdur. Biz tez-tez bir-birimizə qonaq gedirik. Hər gün dərsdən sonra Elgünlə birlikdə ikinci mərtəbədə tənha yaşayan Fatma nənəyə baş çəkirik. Mağazadan ona lazım olan şeyləri alırıq. Anam deyir ki, yaxşı qonşusu olan adam xoşbəxtdir.



**?**

*1. Ən yaxın qonşunuz kimdir?*
*2. Qonşu uşaqlardan kimlərlə dostluq edirsiniz?*
*3. Qocalara necə kömək edirsiniz?*



## *7-ci dərs* Vətənimiz, paytaxtımız.

**A** İnsanın bir anası olduğu kimi, bir də Vətəni olur. Bizim Vətənimiz Azərbaycandır. Babalarımız, nənələrimiz, atalarımız, analarımız burada doğulub, burada da yaşayıblar. Biz də burada doğulub, onun havası, suyu, çörəyi ilə böyüyürük. Doğma Azərbaycanın başı qarlı uca dağları, bərəkətli çölləri, coşqun çayları var. Vətənimizə «Odlar yurdu» da deyirlər, çünki burada neft və çoxlu yanar qaz çıxarılır.



**?**

*1. Vətənimizin adı nədir?*
*2. Himnimiz hansı sözlə başlayır? Bəs, hansı sözlə qurtarır?*
*3. Vətənimizə nə üçün «Odlar yurdu» deyirlər?*



Azərbaycan Respublikasının Prezidenti cənab **İlham Əliyev**



Prezident sarayı

**B** Azərbaycanın çoxlu şəhərləri var. Onların ən böyüyü və ən gözəli Bakıdır. Bakı Xəzər dənizinin sahilində yerləşir. Orada çoxlu hündür binalar, gözəl parklar, muzeylər, teatrlar və idman kompleksləri var.

Bakı həm də Vətənimizin paytaxtıdır. Ölkəmizin prezidentinin sarayı Bakıda yerləşir. Prezidentimiz orada işləyir, başqa ölkələrin başçılarını qəbul edir. Azərbaycanın Respublikasının Prezidenti cənab **İlham Heydər oğlu Əliyev**dir.



Bakının görünüşü





Bakının qədim qala divarları



Qız qalası



Hökumət evi



Filarmoniya



Şəhidlər xiyabanı

?

1. *Azərbaycanın şəhərlərinin ən böyüyü hansıdır?*
2. *Ölkəmizin paytaxtı hansı şəhərdir?*
3. *Azərbaycan Respublikasının prezidenti kimdir?*

| *8-ci dərs* | **Bayrağımız, himnimiz.*** |
|---|---|






Bayrağımızın üzərindəki aypara və səkkizguşəli ulduz

**A** Hər bir ölkəni onun bayrağı ilə tanıyırlar. Bizim bayrağımızda üç rəng var: mavi, qırmızı, yaşıl. Mavi — göylərin rəngidir, təmizlik, müqəddəslik deməkdir. Qırmızı — qan rəngidir, inkişaf və müasirlik deməkdir. Yaşıl — otların, yarpaqların rəngidir, həyat deməkdir. Qırmızı rəngin üzərində aypara və səkkizguşəli ulduz var. Ata-babalarımız üçrəngli bayrağımızı başları üzərinə qaldıraraq düşmənlə mübarizəyə qalxıblar. İdmançılarımız yarışlarda qalib gələndə onu göylərə qaldırırlar.

**?**

*1. Bayrağımızda hansı rənglər var?*
*2. Bu rənglərin hər biri nəyi göstərir?*
*3. Bayrağımızdakı aypara və ulduz hansı rəngin üzərindədir?*










**B** Nənələrimiz, babalarımız, böyüklərimiz tez-tez bizə alqış edir, «Xoşbəxt olun!» deyirlər. Himn də insanların öz Vətənlərinə etdiyi alqışdır. Biz bayram günlərində himnimizi oxuyur, Azərbaycanımıza «Üçrəngli bayrağınla məsud yaşa!» deyirik. Himni oxuyarkən sağ əlimizi ürəyimizin üstünə qoyur, Vətənimizə ürəkdən alqış edirik.

**?**

*1. Himn nədir?*
*2. Himnimizi hansı günlərdə oxuyuruq?*
*3. Himnimizi oxuyarkən niyə əlimizi ürəyimizin üstünə qoyuruq?*

## ÇALIŞMALAR

**1.** Bayrağımızı göstərin.





**2.** Himnimizi oxuyarkən necə durmalıyıq?





**3.** Azərbaycan əsgərini göstərin.







# VARLIQLAR

# CANLILAR və CANSIZLAR




**II bölüm**




*9-cu dərs*

# Ətrafımızdakı varlıqlar.



**A** Hər yerdə bizi müxtəlif varlıqlar əhatə edir: evimizdə ailə üzvlərimiz, stol, stul, televizor, soyuducu, divan, çarpayı; məktəbdə müəllim, şagird, parta, yazı taxtası, şkaf; həyətdə insanlar, ağaclar, otlar, heyvanlar, quşlar, cücülər, binalar, maşınlar. Ayağımızın altındakı daş, torpaq da varlıqdır.

**?**

*1. Yuxarıdakı şəkildə hansı varlıqları görürsünüz?*
*2. Həmin şəkildə ən böyük varlıq hansıdır?*
*3. Aşağıdakı varlıqların adlarını söyləyin.*





**B** Varlıqlar bir-birindən yalnız ölçüləri, formaları, rəngləri ilə deyil, həm də canlı və cansız olmaları ilə fərqlənir. Canlı varlıq nəfəs alır, qidalanır, inkişaf edir, çoxalır, qocalır və ölür. İnsanlar, heyvanlar və bitkilər canlı varlıqlardır. Daş, torpaq, bina, maşın, stol, stul isə cansız varlıqlardır.



Cansız varlıqlar



Canlı varlıqlar

**?**

*1. Mənzilinizdə gördüyünüz varlıqlardan ən böyüyü hansıdır?*
*2. Həyətdə gördüyünüz ən kiçik canlı varlığın adı nədir?*
*3. Dibçəkdəki gül canlıdır, yoxsa cansız?*

**C** İnsanlar, heyvanlar, bitkilər, daş, torpaq, hava və su təbii varlıqlardır. Binalar, maşınlar, körpülər, təyyarələr, gəmilər isə süni varlıqlardır, çünki onları insanlar yaradıblar. Süni varlıqlar təbii varlıqlardan düzəldilir: məsələn, daşdan ev tikirlər, ağacdan stol düzəldirlər, heyvanların dərisindən kürk, papaq tikirlər.



Təbii varlıqlar



Süni varlıqlar

## ÇALIŞMALAR

**1. Cansız** varlıq hansıdır?





**2.** Canlı varlıq hansıdır?





**3.** Təbii varlıq hansıdır?





**4.** Süni varlıq hansıdır?







*10-cu dərs*

# Ev heyvanları və quşları.

**A** İnsanlar hələ qədim zamanlardan bəzi heyvanları və quşları əhliləşdiriblər. Əhliləşdirilmiş heyvanlara ev heyvanları, quşlara isə ev quşları deyirik. Uzun illərdən bəri atlardan minik və qoşqu vasitəsi kimi istifadə edirlər. İnəkdən, qoyundan, keçidən süd sağıb qatıq, yağ, pendir, ayran düzəldirlər. İt evlərimizi, heyvanlarımızı qoruyur. Pişik siçanları ovlayır. Toyuğun, qazın, ördəyin yumurtasından, tükündən, ətindən istifadə olunur.



**?**

*1. Daha hansı ev heyvanlarını tanıyırsınız?*
*2. Daha hansı süd məhsullarını tanıyırsınız?*
*3. Qəfəsdəki quşları nə üçün ev quşları adlandırmırıq?*



**B** Heyvanlar balalamaq, quşlar isə yumurtlamaq yolu ilə çoxalırlar. Bəzi ev heyvanları və quşlarının balalarının adı da var: məsələn, atın balası dayça, inəyin balası buzov, camışın balası kəlçə, qoyunun balası quzu, keçinin balası oğlaq, toyuğun balası cücədir.



**?**

*1. İnəyi harada saxlayırlar?*
*2. Bəs, toyuqları harada saxlayırlar?*
*3. Ev heyvanlarını nə ilə yemləyirlər?*

**!** ***Yadda saxlayın*** *Bütün quşların qanadları var.*



## ÇALIŞMALAR

**1.** Ev heyvanı hansıdır?



**2.** Ev quşu hansıdır?



**3.** Hansı inəyin balası **deyil**?



**4.** Ət **yeməyən** heyvan hansıdır?



## *11-ci dərs* **Bitkilər və onların orqanları.***

**A** Ətrafımızda olan canlı varlıqların bir hissəsi də bitkilərdir. Bitkilər dedikdə ağaclar, kollar və otlar başa düşülür. Onlar meşələrdə, çöllərdə, dağlarda, dərələrdə, bağça və bağlarımızda bitir. İnsanlar bitkiləri çox sevdiklərindən, onların bəzilərini evdə dibçəkdə əkirlər. Bitkiləri gövdəsinə, budaqlarına, yarpaqlarına və meyvələrinə görə tanımaq olur.













! **Yadda saxlayın** *Ağacın bir, kolun isə bir neçə gövdəsi olur.*

?
1. *Dibçəkdə əkilən bitkilərdən hansıları tanıyırsınız?*
2. *Qızılgül bitkisi koldur, yoxsa ot?*
3. *Fındıq bitkisi koldur, yoxsa ağac?*



**B** Bitkinin bir hissəsi torpağın altında, digər hissəsi isə üstündə yerləşir. Torpağın altındakı hissə kökdən, üstündəki hissə isə gövdə və budaqlardan ibarətdir. Budaqlarda yarpaqlar, çiçəklər, meyvələr və toxumlar əmələ gəlir. Bitkilər kökün, gövdənin, yarpaqların köməyi ilə qidalanır, tənəffüs edir. Bitkilər toxumları, gövdəsi və kökləri vasitəsilə çoxalır.







?
1. *Bitkilər hansı orqanları vasitəsilə qidalanır?*
2. *Bitkilər hansı orqanları vasitəsilə çoxalır?*
3. *Ağacın gövdəsi böyükdür, yoxsa kolun?*

! **Yadda saxlayın** *Bitkilərin yaşaması üçün torpaq, su, hava, işıq və istilik lazımdır.*

## ÇALIŞMALAR

**1.** Kol bitkisinin meyvəsi hansıdır?



**2.** Bitkinin gövdəsi hansıdır?



**3.** İynəyarpaqlı ağac hansıdır?



**4.** Bitki hansı orqanı ilə torpaqdan qida alır?





*12-ci dərs*

# Bitkilərin faydası.

**A** Bitkilər təmiz hava mənbəyidir. Ona görə də insanlar istirahət üçün həmişə parklara, bağlara, meşələrə gedirlər. Bitkilərin bəzilərinin meyvələrindən, toxumlarından, bəzilərinin isə yarpaq və köklərindən qida məhsulu kimi istifadə edilir. Bir çox bitkilərdən ayrı-ayrı xəstəliklər üçün dərman hazırlanır. Ağacların oduncağından yaraşıqlı mebellər düzəldirlər. Tikinti işlərində də ağacdan istifadə edirlər. Soyuq havalarda evləri qızdırmaq, yemək hazırlamaq üçün ağac oduncağı lazım olur. Kitab və dəftərlərimizin kağızı da ağacdan hazırlanır.





**?**

*1. İnsanlar nə üçün meşədə dincəlməyi sevirlər?*
*2. Şəkildə gördüklərinizin adlarını söyləyin.*
*3. Daha hansı meyvələri tanıyırsınız?*

**!** ***Yadda saxlayın*** *Meyvə və tərəvəz insanın sağlamlığı üçün çox faydalıdır.*

**B** İnsanların qida kimi istifadə etdiyi çörək də bitkidən alınır. Həmin bitkinin adı buğdadır. Əvvəlcə torpağı şumlayıb buğda toxumu səpirlər. Toxumlar cücərib böyüyür, sünbüllər dən tutur. Dəni kombaynların köməyi ilə yığır, onu dəyirmanda üyüdərək un hazırlayırlar. Undan isə çörək bişirilir.





**?**

*1. Çörək nədən hazırlanır?*
*2. Buğda əkilmiş sahəyə nə deyirlər?*
*3. Undan hazırlanan daha hansı qida məhsullarını tanıyırsınız?*

**C** Bir çox heyvanlar bitkilərin yarpaqları, meyvələri və toxumları ilə qidalanır. Bəzi heyvanlar yuvalarını onların gövdəsində, bəziləri isə budaqlarında qurur. Arılar bitkilərin çiçəklərindən şirə çəkir.



**?**

*1. Sincabın yuvası harada yerləşir?*
*2. Qarğa öz yuvasını harada qurur?*
*3. Arı yuvasına nə deyilir?*



## ÇALIŞMALAR

**1.** Bu heyvanlardan hansı yalnız bitkilərlə qidalanır?



**2.** *«Ayağından su içər,*
*Dimdiyindən balalar.»* —
tapmacasının cavabı aşağıdakılardan hansıdır?



**3.** Bu quşlardan hansı öz yuvasını ağacın başında qurur?



**4.** Hansından kağız hazırlanır?



| *13-cü dərs* | **Ayağımızın altındakı Yer, başımızın üstündəki Göy.*** |
|---|---|

**A** Biz hamımız Yer adlanan planetdə yaşayırıq. Ətrafımızda gördüyümüz və indiyədək haqqında danışdığımız varlıqlar da Yer üzərindəki varlıqlardır. Yer yuvarlaq şəkildədir. Kürəyə bənzədiyindən ona Yer kürəsi deyirlər. Yeri topa, qarpıza, portağala da bənzətmək olar. Lakin çox böyük olduğundan onun yuvarlaqlığını görə bilmirik. Bunu təsəvvür etmək üçün Yerin modelinə — qlobusa baxmaq lazımdır.



**?**

*1. Yer kürəsini daha hansı varlıqlara bənzətmək olar?*
*2. Yerin modelinə nə deyirik?*




Günəş və onun ətrafında fırlanan planetlər

**B** Günəş daim yanan, işıq saçan və Yerə ən yaxın olan ulduzdur. O, hər səhər doğub dünyamızı işıqlandırır. Günəş bizə yalnız işıq yox, həm də istilik verir. İşıq və istilik olmasa canlılar yaşaya bilməz. Yer kürəsi Günəşin ətrafında fırlanır. Günəşin ətrafına fırlanan daha səkkiz planet var.

**?**

*1. Günəş hansı formadadır?*
*2. Yerə ən yaxın ulduz hansıdır?*
*3. Günəş olmasa nə baş verər?*



**C** Gecələr başımız üstündə Ay və saysız-hesabsız ulduz müşahidə edirik. Ay böyük göy varlığı kimi görünür. Əslində isə o, ulduzlardan çox kiçikdir. Yerə daha yaxın olduğundan böyük görünür. Ay Yerin ətrafında fırlanır. Fırlanma zamanı onun görünüşü dəyişir — gah kürəyə, gah yarımkürəyə, gah da hilala bənzəyir. Ay ulduzlar kimi işıq saçmır, güzgü kimi Günəş işığını əks etdirir. İnsanlar bir neçə dəfə Ayda olmuşlar. Ayda hava və su yoxdur. Ona görə də orada canlılar yaşamır.

Göy varlıqlarını teleskop adlanan cihazla müşahidə edirlər.



Qlobus



Ayın müxtəlif görünüşləri



Teleskop



Ayda insan

**?**

*1. Yerə ən yaxın olan göy varlığı hansıdır?*
*2. Günəş böyükdür, yoxsa Ay?*

## ÇALIŞMALAR

**1.** Yer kürəsinə bənzəyən hansıdır?





**2.** Hansı daha böyükdür?





**3.** Hansında həyat var?





**4.** Günəşi narıncı, Yeri mavi, Ayı isə sarı karandaşla rəngləyin.





*14-cü dərs* **Fəsillər. Payız.**

**A** Yerin Günəş ətrafında fırlandığını bilirik. Bu fırlanma bir ilə başa çatır. Bir ildə dörd fəsil var: yaz, yay, payız, qış. Hər fəsil üç aydan ibarətdir.




**?**

*1. Yer Günəşin ətrafına bir dəfə fırlanınca nə qədər vaxt keçir?*
*2. İlin fəsilləri hansılardır?*
*3. Payızdan sonra hansı fəsil gəlir?*

**B** Fəsillərin dəyişməsi hər yerdə özünü göstərir. Payızda hava və su get-gedə soyumağa başlayır. Tez-tez yağışlar yağır. Adamlar yay geyimlərini isti geyimlərlə əvəz edirlər. Köçəri quşlar isti ölkələrə uçub gedir. Kirpi, siçan və sincab yuvalarına bitki toxumları, qoza daşıyıb qış tədarükü görürlər. Qonur ayı və porsuq qış yuxusunu rahat keçirmək üçün çoxlu yeyib, kökəlir. Ağacların, kolların yarpaqları saralıb xəzəl olur. Otlar quruduqca yarpaqları, toxumları yerə səpələnir. Alma, armud, heyva, nar, üzüm, itburnu, yemişan yetişir. İnsanlar onları yığıb, tədarük edirlər. Sentyabr, oktyabr, noyabr payız aylarıdır.







**?**

*1. Payızda ağaclarda hansı dəyişiklikləri müşahidə edirsiniz?*
*2. Nə üçün payızda bəzi quşlar uçub gedirlər?*
*3. Payızda bağlarda, tarlalarda hansı işlər görülür?*



## ÇALIŞMALAR

**1.** Hansılar payızda yetişir?










**2.** Payızda isti yerlərə uçub gedən quşları göstərin.










*15-ci dərs*

# Su. İçməli və çirkli sular.*

**A** İstifadə etdiyimiz qlobusda göy rəng Yer kürəsinin su olan hissəsini, yaşıl rəng isə quru hissəsini göstərir. Diqqətlə baxsaq, göy hissənin yaşıl hissədən böyük olduğunu görərik. Bu, o deməkdir ki, Yerin su olan hissəsi quru hissəsindən böyükdür. Su okeanlarda, dənizlərdə, göllərdə, çaylarda və bulaqlarda olur. İnsanlar suyu içir, onunla yemək hazırlayır və təmizlik üçün istifadə edirlər. Sudan hər yerdə istifadə olunur. Canlılar havasız, işıqsız, istiliksiz yaşaya bilmədikləri kimi, susuz da yaşaya bilmirlər.




**?**
1. *Yaşadığınız yerdə bulaq, çay, göl varmı? Onların adı nədir?*
2. *Şəkildəki evə su neçə yerdən gəlir? Onlardan hansı təmizlənir?*
3. *Təmizlənməmiş su çaya axdıqda nə baş verir?*



**B** Yer kürəsindəki suların az bir hissəsi içməlidir. Okeanların, dənizlərin və əksər göllərin suyu şoran və acıdır. Onlardan içmək, bitkiləri suvarmaq üçün istifadə etmirlər. İnsanlar içməli suyu bulaqlardan, su quyularından və çaylardan götürürlər. Çayların suyu xüsusi stansiyalarda təmizləndikdən sonra ondan evlərdə istifadə edilir.

Mənzillərdə işlədilmiş su borularla başqa stansiyaya ötürülür. Orada təmizləndikdən sonra yenidən çaya və yaxud dənizə axıdılır.

**?**
1. *Okeanların və dənizlərin suyu niyə içilmir?*
2. *Evinizə içməli su haradan gəlir?*
3. *Evinizdə istifadə olunmuş çirkli sular hara axıdılır?*


Arx


Göl


Suvarma

**C** Bitkilər vaxtlı-vaxtında suvarılanda daha yaxşı inkişaf edir, bol məhsul verir. Havalar isti keçəndə bitkiləri suvarmasan onlar quruya bilər. Ona görə də insanlar bağ, bağça və tarlaları suvarmaq üçün kanallar və arxlar çəkirlər. Çayların və bulaqların suyunu kanallar və arxlarla uzaq yerlərdən yaşayış yerlərinə gətirirlər.

**?**
1. *Nəyə görə göllərin ətrafında bitkilər daha yaxşı inkişaf edir?*
2. *«Su gələn yer gülüstan olar» sözlərini necə başa düşürsünüz?*

## ÇALIŞMALAR

**1.** Hansının suyu içməlidir?










**2.** Yer kürəsinin su olan hissəsini göy, quru hissəsini isə yaşıl karandaşla rəngləyin.





*16-cı dərs*

# Suda yaşayan canlılar.

**A** Canlılar Yer kürəsinin yalnız quru hissəsində yox, həm də sularında yaşayırlar. Okeanların, dənizlərin, göllərin, çayların dibində müxtəlif su bitkilərinə rast gəlmək olar. Bu bitkilərin ən çox yayılmışı yosunlardır. Bəzən dənizlərin dibindəki yosun sahələri çiçəkli çəmənliyə bənzəyir. Heyvanların ən böyüyü göy balina, ən ağıllısı delfin də suda yaşayır. Dənizlərdə suiti, köpəkbalığı kimi yırtıcı heyvanlar, çoxlu iri və xırda balıqlar olur. Onların əksəriyyəti suda doğulur, yaşayır və çoxalırlar. Beləleri sudan kənarda çox yaşaya bilmirlər.




**?**

*1. Dünyanın ən böyük heyvanının adı nədir?*
*2. Dünyanın ən ağıllı heyvanının adı nədir?*
*3. Köpəkbalığına nə üçün yırtıcı deyirlər?*

**B** Vətənimizin çaylarında, göllərində cürbəcür balıqlar yaşayır. Xəzər dənizində suiti və müxtəlif balıqlar var.

Azərbaycanın ən qiymətli balığı nərədir. Nərə balığının kürüsü kimi əti də çox ləzzətlidir. Bayramlarda süfrəmizi bəzəyən balıqlardan biri də ziyad balığıdır. Bu balıqlar Xəzər dənizində və Kür çayında yaşayırlar.



**?**

*1. Azərbaycanın ən qiymətli balığının adı nədir?*
*2. Daha hansı balıqları tanıyırsınız?*



## ÇALIŞMALAR

**1.** Delfin hansıdır?



**2.** Əvvəlki səhifədəki şəkillərdən istifadə edərək rəsmləri tamamlayın.





**3.** Soldakı canlıların hər birini öz balası ilə birləşdirin.





# TƏBİƏT HADİSƏLƏRİ



*17-ci dərs*

# Gündüz və gecə.

**A** Hər səhər Günəş gündoğandan baş qaldırıb ətrafa işıq saçır. Qaranlıq çəkilib gedir, ulduzlar görünməz olur. Gündüz başlayır. Quşların, cücülərin səsi eşidilir. Böyüklər işə, uşaqlar məktəbə tələsirlər. Tarlalarda, zəmilərdə, bağlarda, zavod və fabriklərdə hərə bir iş görür. Yollar müxtəlif avtomobillərlə dolur. Quşlar balalarına, qarışqalar yuvalarına yem daşıyırlar. Arılar çiçəkdən-çiçəyə qonub şirə çəkirlər.


Xəzərdə Günəş doğur


Sərçə balalarına yem gətirir

**?**
*1. Gündüz niyə ulduzlar görünmür?*
*2. Aşağıdakı şəkillərdə hansı işlər görülür?*







**B** Günəş axşam yavaş-yavaş günbatana enir, sanki dağların arxasında gizlənir. Quşlar, cücülər yuvalarına çəkilirlər. Qaranlıq qarışır. Göydə Ay və ulduzlar görünür. Gecə başlayır. Evlərdə işıqlar yanır. İşdən qayıdan insanlar istirahət edirlər. Sabah səhər yenə də Günəş doğacaq, hamı öz işinə gedəcək.

Elə işlər var ki, onlar gecələr də davam edir. Belə işləri gecə növbəsində işləyən insanlar görürlər. Bəzi yırtıcı heyvanlar da ova gecələr çıxırlar.


Günəş batır


Ay və ulduzlar görünür

**?**
*1. Gecə ova çıxan heyvanlardan hansını tanıyırsınız?*
*2. Gecələr hava gündüzə nisbətən niyə soyuq olur?*

**C** Gecə və gündüz necə əmələ gəlir? Bunu izah etmək üçün Günəşin əvəzinə əl fənəri, Yerin əvəzinə isə qlobus götürək. Qaranlıq otaqda fənərin işığını qlobusun üzərinə salaq. Qlobusun bir tərəfi işıqlı, o biri tərəfi qaranlıq görünəcək. Bax, gecə və gündüz də bu cür əmələ gəlir. Günəşin Yeri işıqlandırdığı tərəfdə gündüz, o biri tərəfdə isə gecə olur. Qlobusu fırlatsaq, fənər ardıcıl olaraq onun gah bu, gah da o biri tərəfini işıqlandıracaq. Yer daim fırlandığına görə gecə və gündüz bir-birini əvəz edir.





## ÇALIŞMALAR



Varlıqlardan hansılar yuxarıdakı «Gündüz» rəsminə **səhvən** salınıb?





# 18-ci dərs Külək necə əmələ gəlir?*

**A** Günəş Yerin ayrı-ayrı hissələrini müxtəlif cür qızdırır. Həmişə onun bir tərəfi isti, başqa tərəfi soyuq olur. Daha isti olan tərəflərdə Yerin qızdırdığı hava yüngül olduğundan yuxarı qalxır. Onun yerinə isə soyuq hava dolmağa başlayır. Beləliklə, havanın yerdəyişməsi baş verir. Buna külək deyirik.




Küləyin əmələ gəlməsi

**Yadda saxlayın** *Hərəkət edən havaya külək deyilir.*

**B** Sürətinə görə küləklərə müxtəlif adlar verirlər: zəif küləyə **meh**, çox güclü küləyə isə **qasırğa** deyilir. Ölkəmizdə ən çox külək əsən yer paytaxtımız Bakı və onun ətrafıdır. Ona görə də keçmiş zamanlardan Bakıya «Küləklər şəhəri» deyirlər. Bakıda küləklərin bəzilərinin öz adı da var. Burada soyuq küləyə **xəzri**, mülayim küləyə isə **gilavar** deyirlər.

?

1. *Külək necə əmələ gəlir?*
2. *Hansı küləyə meh, hansına tufan deyirik?*
3. *Bakıya niyə «Küləklər şəhəri» deyirlər?*

**C** Küləyin insanlara həm faydası, həm də böyük ziyanı olur. İsti, qızmar vaxtlarda külək sərin və təmiz hava, bəzən də yağış gətirir. O, yel dəyirmanlarını, külək elektrik stansiyalarını işlədir. Yelkənli qayıqları və yelkənli gəmiləri hərəkətə gətirir. Güclü küləklər ağacların qol-budağını sındırır, meyvələri tökür, əkinlərə ziyan vurur, evlərin damını uçurur. Dənizdə fırtına yaradıb gəmiləri batırır. Bəzən qasırğalar yaşayış yerlərini xarabalığa çevirir.


Yel dəyirmanı


Yelkənli gəmi


Qasırğa


Qasırğadan sonra


Dənizdə fırtına

**?**

*1. Küləklərin insanlara hansı faydası var?*
*2. Güclü küləklər insanlara nə kimi ziyan vurur?*

**!** ***Yadda saxlayın***

*Güclü külək zamanı pəncərələrin, ağacların, kolların, elektrik məftillərinin altında, taxta barıların, yüngül əşyaların yanında dayanmaq olmaz!*



## ÇALIŞMALAR

**1.** Hansı şəkil külək əsəndə çəkilib?





**2.** Aşağıdakılardan hansı küləklə işləyir?





**3.** Hansını külək hərəkətə gətirir?





*19-cu dərs*

# Niyə yağış yağır?

**A** Günəş dənizləri, gölləri, çayları isitdikcə suyun xırda, gözlə görə bilmədiyimiz hissəcikləri buxarlanıb isti hava ilə birlikdə yuxarı qalxır. Bu hissəciklər toplaşıb bulud əmələ gətirir. Hissəciklər soyuyub birləşdikcə ağırlaşır. Daha göydə qala bilməyib, damcılar şəklində yerə tökülür. Beləliklə, yağış əmələ gəlir. Yağışlar zəif və güclü olur.



Yağışın əmələ gəlməsi

**?** *1. Bulud necə əmələ gəlir?*
*2. Yağış necə əmələ gəlir?*

**!** ***Yadda saxlayın*** *Qalın qara buludlar çox vaxt özü ilə yağış və ya dolu gətirir.*



**B** Yağış bitkilərə həyat verir. Bitkilər yağışdan sonra daha yaxşı böyüyür, inkişaf edir. Yağış bulaqların, çayların, göllərin suyunu artırır. Su anbarları dolur. İnsanlar əkinlərini, bağ-bağçalarını suvarmaq, içməli su götürmək üçün çətinlik çəkmirlər. Yağış yağmasa, quraqlıq olar, — bitkilər quruyar, heyvanlar məhv olar.





**?** *1. Yağışın insanlara faydası nədir?*
*2. Uzun müddət yağış yağmasa nə baş verər?*

**C** Yağışın insanlara ziyanı da ola bilir. Bəzən günlərlə, ara vermədən yağış yağır. Belə yağışlara **leysan** deyilir. Leysan zamanı hər tərəfi su basır, əkinlər, bağ-bağça su altında qalır, heyvanlar tələf olur.

Leysan böyük daşqınlar da əmələ gətirir. Bu daşqınlar bəzən körpüləri uçurur, sahildəki evləri, yolları dağıdır.





**?** *1. Hansı yağış daşqınlar əmələ gətirir?*
*2. Daşqınlar ətraf mühitə nə kimi ziyan vurur?*

## 20-ci dərs

# Dolu və qar.

**A** Buxarlanıb yuxarı qalxan su hissəcikləri bəzən donub buz parçalarına çevrilərək yerə tökülür. Dolu adlanan bu buz parçaları hərdən toyuq yumurtası irilikdə olur. Dolu, adətən, ilin isti vaxtlarında yağır.

Dolu insanlara, bitkilərə və heyvanlara çox böyük ziyan vurur. Taxıl zəmilərini, dirrikləri, meyvə bağlarını məhv edir. Evlərin dam örtüklərini, avtomobilləri zədələyir.

Dolu yağarkən açıq havada durmaq olmaz, çünki iri buz parçaları bədənimizə xətər yetirə bilər.



**?**

*1. Dolu ilin hansı vaxtlarında yağır?*
*2. Dolunun bitkilərə vurduğu ziyan nədir?*
*3. Dolu evlərə və avtomobillərə nə kimi ziyan vurur?*



**B** Doludan fərqli olaraq qar ilin soyuq vaxtlarında yağır. Göyün soyuq qatlarına qalxmış su hissəcikləri donub çox kiçik qar dənəciklərinə çevrilir. Bu dənəciklər əksər hallarda altıguşəli ulduz şəklində olur. Bir qədər isti havada qar dənəciklərinin bəziləri yerə çatmamış əriyib suya çevrilir. Belə qara sulu qar deyilir. Hava soyuq olanda isə qar dənəcikləri yerdə üst-üstə yığılaraq ağ örtük əmələ gətirir. Hər tərəf dümağ olur. Qar çox yağanda bulaqların, çayların suyu gur, məhsul bol olur. Qarın çox yağması bəzən çətinliklər də yaradır. Yollar bağlanır, gediş-gəliş çətinləşir. Çöl heyvanları və quşları yem tapmaqda çətinlik çəkirlər.



**?**

*1. Qar dənəcikləri nəyə oxşayır?*
*2. Nəyə görə qar ancaq ilin soyuq vaxtlarında yağır?*
*3. «Qar çox olarsa, bolluq olar» sözlərinin mənasını necə başa düşürsünüz?*

## ÇALIŞMALAR

**1.** Buludlardan hansı dolu gətirə bilər?





☐ ☐ ☐

**2.** Ancaq qar dənəcikləri olan şəkil hansıdır?





☐ ☐ ☐

**3.** Qar dənəciklərini göy karandaşla rəngləyin.






## *21-ci dərs* Qış.

**A** Payızdan sonra qış gəlir. Qış ilin ən soyuq fəslidir. Qışda gündüzlər qısa, gecələr uzun olur. Qaranlıq tez düşür. Göyün üzü çox vaxt tutqun olur. Günəş hərdənbir görünür. Bitkilərin inkişafı dayanır. Həmişəyaşıl ağaclardan başqa bütün ağaclar çılpaq olur. Tez-tez qar yağır, hər tərəf ağ örtüyə bürünür. Şaxta-sazaq suları dondurur. Gölməçələrin, arxların, çayların hətta göllərin üstü buz bağlayır. Yollar buz bağladığından avtomobillərin hərəkəti çətinləşir.

İnsanlar soyuqdan qorunmaq üçün isti paltar geyinirlər. Uşaqlar həyət-bacada qartopu oynayır, xizəklə sürüşürlər. Dekabr, yanvar, fevral qış aylarıdır.






**?**

*1. Qışda gündüzlər uzun olur, yoxsa gecələr?*
*2. Qışda yarpağını tökməyən hansı ağacları tanıyırsınız?*
*3. Qışda gölməçələr niyə buz bağlayır?*











**B** Qışda hər tərəf qarla örtüldüyündən, heyvanların yaşayışı çətinləşir. Çöldə ot olmadığına görə insanlar ev heyvanlarını pəyələrdə saxlayırlar.

Çöl heyvanları qarlı çöllərdə, meşələrdə özlərinə yem tapmaq üçün daha çox gəzməli, bəzən də günlərlə ac qalmalı olurlar. Qonur ayı, kirpi, porsuq öz yuvalarında qış yuxusuna gedirlər. Balıqlar, qurbağalar suyun dibinə çəkilirlər. Uşaqlar qarda heç nə tapa bilməyən sərçə, dolaşa və sığırçınlar üçün dənlik düzəldir, onları yemləyirlər.

**?**

*1. Qışda ev heyvanlarını niyə pəyədə saxlayırlar?*
*2. Qış yuxusuna gedən heyvanlardan hansını tanıyırsınız?*
*3. Qarlı günlərdə quşların çətin yem tapmasının səbəbi nədir?*



## ÇALIŞMALAR

**1.** Hansı şəkildə qış təsvir olunub?



**2.** Canlı varlıqlardan hansılar «Qış» rəsminə səhvən salınıb?



## 22-ci dərs — İldırım və göy qurşağı.

**A** İlin müxtəlif vaxtlarında bəzən göyün üzünü qatı qara buludlar tutduğunu görürük. Əksər hallarda güclü yağış gətirən həmin buludların içində çoxlu elektrik toplanır. Birdən gözqamaşdırıcı şimşək görünür, arxasınca da qulaqbatırıcı gurultu eşidilir. Bu ildırımdır.

İldırım çox təhlükəlidir. O, hündür tənha ağacları, dirəkləri, qüllələri daha tez vurur. Ona görə də ildırım çaxarkən belə yerlərdən tez uzaqlaşmaq lazımdır.


Şəhər üzərində ildırım


Dağlarda ildırım



**?**
*1. İldırım ilin hansı vaxtlarında daha çox çaxır?*
*2. Əvvəl ildırımın işığını görürük, yoxsa səsini eşidirik?*
*3. Niyə ildırım çaxarkən tək ağacın, hündür dirəyin yanında dayanmaq olmaz?*



**B** Yağış yağarkən bəzən göydə Günəş görünür. Onun şüaları havadakı su damcılarına düşüb, göy qurşağını əmələ gətirir. Göy qurşağını günəşli günlərdə şəlalələrin, fəvvarələrin yanında da müşahidə etmək olar. O, yarımdairə şəklində olur.

Göy qurşağının yeddi rəngi var: qırmızı, narıncı, sarı, yaşıl, mavi, göy, bənövşəyi. Böyüklüyündən və harada görünməsindən asılı olmayaraq göy qurşağının rənglərinin düzümü dəyişmir.


Göy qurşağı


Şəlalədə göy qurşağı


Dağlarda göy qurşağı

**?**
*1. Göy qurşağı görmüsünüzmü? Nə zaman?*
*2. Göy qurşağının hansı rəngləri var?*

## ÇALIŞMALAR

**1.** İldırım çaxarkən heyvanlardan hansı daha təhlükəsiz yerdə gizlənib?



**2.** Günəşin və göy qurşağının rənglərini tamamlayın.





*23-cü dərs*

# Zəlzələ. Zəlzələ zamanı nə etməli?*

**A** İnsanlara çox böyük ziyan vuran təbiət hadisələrindən biri də zəlzələdir. Zəlzələ zamanı ayağımızın altında yer tərpənir, tavanda çılçıraqlar yellənir, divarlarda çatlar əmələ gəlir. Güclü zəlzələ möhkəm tikilməmiş binaları, körpüləri dağıdıb xarabalığa çevirir. Dağları və qayaları uçurur, yerdə dərin çatlar və yarğanlar əmələ gətirir. Zəlzələnin harada və nə vaxt olacağını heç kəs qabaqcadan xəbər verə bilmir.

Keçmişdə insanlar elə bilirdilər ki, Yer nəhəng bir öküzün buynuzları arasındadır. Guya öküz nəyəsə hirslənəndə başını silkələyir və beləliklə də zəlzələ əmələ gəlir.

Əslində isə zəlzələ yerin dərinliklərində baş verən təkanlardır.



**?** *Güclü zəlzələ zamanı nələr baş verir?*

**!** ***Yadda saxlayın*** *Zəlzələ zamanı məktəbdəsinizsə müəllimin, evdəsinizsə böyüklərin göstərişlərinə ciddi əməl edin!*









**B** Zəlzələ gözlənilmədən və çox qısa müddətdə baş verdiyindən, insanlar bəzən çaşqınlıqdan nə edəcəklərini bilmirlər. Ona görə də zəlzələdən qorunma qaydalarını əvvəlcədən öyrənmək lazımdır.

**Zəlzələ vaxtı evdə və ya sinifdəsinizsə:**

— *tavandan düşə biləcək şeylərdən qorunmaq üçün başınıza balış, çanta və ya kitab tutun, stolun və ya partanın altında gizlənin;*

— *şkafın və başqa aşa biləcək əşyaların yanında dayanmayın;*

— *pəncərənin qarşısında və balkonda durmayın.*



Qonaq otağında





Mətbəxdə



Sinif otağında

**C** **Zəlzələ vaxtı çöldəsinizsə:**

— *binaların, divarların, böyük ağacların yanında durmayın;*

— *balkonların və pəncərələrin altında dayanmayın;*

— *elektrik dirəklərinin, qaz borularının yanından uzaqlaşın;*

— *binalardan aralı, açıq yerdə gözləyin.*



Məktəbdən çıxarkən



Küçə fənərlərindən uzaqlaşın!

! **Yadda saxlayın** *Zəlzələ zamanı içəridə qalmısınızsa, heç nədən qorxmayın, gözləyin. Valideynləriniz mütləq gəlib sizi oradan aparacaqlar!*

?

1. *Nəyə görə zəlzələ vaxtı şkafın yanında dayanmaq olmaz?*
2. *Zəlzələ zamanı məktəbdə özünüzü necə qorumalısınız?*
3. *Zəlzələ zamanı çöldə özünüzü necə qorumalısınız?*

*24-cü dərs*

# Çaylar necə əmələ gəlir və axıb hara gedir?

**A**

Çaylar daim axan sulardır. Onların çoxu başlanğıcını uca dağlardakı buzlaqlardan, bulaqlardan götürür. Yağış, qar və dolu suları da axıb çaylara qarışır.

Çaylar bir-birindən uzunluğuna, eninə və sularının çoxluğuna görə fərqlənir. Kiçik çaylar axıb böyük çaylara, böyük çaylar isə dənizlərə və ya göllərə tökülür. Bəzi kiçik çaylar dənizlərə və göllərə çatmadan quruyur.






Qar və buzlaq suları



Bulaq suyu



Kiçik çay

**?**

*1. Şəkillərə diqqətlə baxın, çayın necə əmələ gəldiyini söyləyin.*
*2. Çaylar axıb hara gedir?*



**B**

Vətənimizin çoxlu iri və xırda çayları var. Onların ən böyüyü Kür çayıdır. Kür çayı axıb Xəzər dənizinə tökülür. Araz və Qanıq da böyük çaylardır. Bir çox başqa çaylarımız kimi onlar da Kürə qarışır. Ona görə də belə çaylara Kürün qolları deyirlər. Kürün və Arazın üstündə su anbarları və elektrik stansiyaları tikilib. Əkin sahələrini, bağları suvarmaq üçün bu çaylardan çoxlu kanallar çəkilib. Bakıda istifadə olunan suyun bir hissəsini də Kürdən götürürlər. Bu su təmizlədikdən sonra əhalinin istifadəsinə verilir.



Çay



Su dəyirmanı



Böyük çay üzərində su elektrik stansiyası

**?**

*1. Azərbaycanın ən böyük çayları hansılardır?*
*2. Yaşadığınız yerdə hansı çaylar var?*
*3. Çayların suyundan nədə istifadə olunur?*

*25-ci dərs*

# Təbiət və ekologiya.

**A** Günəşə, Aya, ulduzlara, havaya, suya, torpağa, dağlara, heyvanlara, bitkilərə və insanlara birlikdə **təbiət** deyilir. Gecə və gündüzün növbələşməsi, küləyin əsməsi, yağışın, qarın, dolunun yağması, zəlzələnin baş verməsi isə **təbiət hadisələridir**. İnsanlar hələ qədim zamanlardan təbiəti öyrənirlər. Amma onun hələ çoxlu açılmamış sirləri qalır. Həmin sirlərin bəzilərini, yəqin ki, biz açacağıq. Bunun üçün çoxlu oxumalı, təbiətdə baş verən hadisələri diqqətlə izləməli və öyrənməliyik.



Təbiət bizim ümumi evimizdir

**?**
*1. «Təbiət» dedikdə nə başa düşürsünüz?*
*2. Təbiət hadisələri haqqında nə bilirsiniz?*



**B** Təbiət bizə hava, su, qida verir. Pambığı, odunu, metalı, nefti və qazı da ondan alırıq. Ona görə də çox vaxt təbiətə «Ana təbiət» deyirik. Hər bir insan təbiəti anası kimi sevməli və qorumalıdır. Ekologiya bizə bunları öyrədir.

Bizdən başqa təbiətdə bitkilər, cücülər, balıqlar, quşlar, heyvanlar da var. Bizim bu ümumi evimizdə hər şey nizamlı deyil. Çayın suyunu çirkləndirəndə balıqlar ölür. Çəməndə çiçəkləri məhv edəndə kəpənəklər yoxa çıxır. Meşələr yananda çoxlu canlı məhv olur. Maşınların, zavodların havaya buraxdığı zəhərli tüstülər insanların sağlamlığına ziyan vurur. Ona görə də ekoloqlar hər bir insanı düşünməyə çağırır və soruşurlar: Sən doğma təbiəti qorumaq üçün nə etmisən?



Çayın çirklənməsi



Çirklənmiş sahil



Meşə yanğını



Havanın çirklənməsi

**?**
*1. «Ana təbiət» sözlərinin mənasını necə başa düşürsünüz?*
*2. Ekologiya bizə nəyi öyrədir?*
*3. Ana təbiəti qorumaq üçün siz nə edə bilərsiniz?*

*26-cı dərs*

# Yaz. Novruz bayramı.

**A** Soyuq, şaxtalı qışdan sonra yaz gəlir. Havalar istiləşir. Gündüzlər uzanır, gecələr qısalır. Əvvəl zoğal, badam, alça, sonra isə başqa ağaclar çiçək açır. Kolların dibində novruzgülü, bənövşə, nərgiz görünür. Torpaqdan yamyaşıl otlar baş qaldırır. Köçəri quşlar qayıdıb özlərinə yuva qururlar. Cücülərin səsi eşidilir. Tarlalarda, bostanlarda və bağlarda işlər yenidən canlanır. Torpağı şumlayıb toxum səpirlər. Meyvə ağaclarını budayır, diblərini yumşaldırlar. Tərəvəz şitillərini istixanalardan sahələrə köçürürlər. Qoyun-quzunu, mal-qaranı pəyələrdən çıxarıb otlaqlara aparırlar.

Mart, aprel və may yaz aylarıdır.










**?**

*1. Yazın gəlməsi ilə təbiətdə hansı dəyişikliklər baş verir?*
*2. Hansı ağaclar daha tez çiçəkləyir?*
*3. Yaz gələndə bağlarda hansı işlər görülür?*



**B** Yazın gəlişini hamı səbirsizliklə gözləyir, çünki o, özü ilə həm də «Novruz bayramı»nı gətirir. Bayramdan əvvəl hamı səməni göyərdir, ev-eşiyi, həyət-bacanı təmizləyir. Nənələrimiz, analarımız şəkərbura, paxlava, badambura, şorqoğal bişirir, yumurta boyayırlar. Novruz axşamı bütün həyətlərdə bayram tonqalı qalanır. Uşaqlar tonqalın üstündən hoppanır, qonşuların evlərinə papaq atırlar. Hər yerdə Novruz tamaşaları göstərilir. Kosa və Keçəl Baharqızla birlikdə Novruz şənliklərinin qonağı olurlar. Onlar maraqlı oyunlar göstərir, gülməli əhvalatlar danışır, oxuyur, oynayırlar.



Baharqız, Keçəl və Kosa

**?**

*1. Səməni nədən göyərdirlər?*
*2. Novruz bayramında yaxınlarınızı necə təbrik edirsiniz?*
*3. Bayram tamaşalarında Kosa haqqında hansı mahnı oxunur?*

## ÇALIŞMALAR

Novruz nemətlərini seçib xonçaya «yığın».





# BİLİK və İNSAN ƏMƏYİ



# 27-ci dərs — Yaşayış məntəqələri. Kənd və şəhər.

**A** Soyuqdan, qardan, yağışdan qorunmaq, rahat yaşamaq üçün insanların evə ehtiyacı var. Keçmişdə onlar torpaq damlarda, palçıqdan, ağacdan tikilmiş darısqal daxmalarda yaşayırdılar. Belə evlərin içərisi yarıqaranlıq, havası nəm olurdu. Adamlar əziyyət çəkir, tez-tez xəstələnirdilər. Sonralar onlar daşdan, kərpicdən, betondan hər cür rahatlığı olan yaraşıqlı evlər tikməyi öyrəndilər. İndi kəndlərimizi, şəhərlərimizi belə gözəl evlər bəzəyir.











**?**

*1. Çoxmərtəbəli binaları hansı texnikanın köməyilə tikirlər?*
*2. Çoxmərtəbəli binaları hansı yaşayış məntəqələrində tikirlər?*



**B** Ölkəmizdə insanlar kəndlərdə, qəsəbələrdə və şəhərlərdə yaşayırlar. Kənd və qəsəbələr kiçik yaşayış məntəqələridir. Burada evlər daha çox bir və ikimərtəbəli olur. Belə evlərin həyətində insanlar bağ salır, dirrik əkirlər. Ev heyvanları və quşlarını saxlamaq üçün pəyə və hin tikirlər. Bəzi evlərin həyətində məhsulu saxlamaq üçün saray da olur.

Şəhərlər böyük yaşayış məntəqələridir. Burada əhalinin əksəriyyəti çoxmərtəbəli binalarda yaşayır. Şəhərdə prospektlər, asfalt küçələr, parklar, muzeylər, teatrlar, müxtəlif idarələr var. Böyük şəhərlərdə çoxlu zavod, fabrik və avtomobil olduğundan onların havası daha çox çirklənir. Bakı, Gəncə, Sumqayıt, Naxçıvan və Mingəçevir ən böyük şəhərlərimizdir.



Kənd



Kənd evi



Şəhər



Şəhər evi

**?**

*1. Siz hansı yaşayış məntəqəsində yaşayırsınız?*
*2. Şəhərlərdə havanın daha çox çirklənməsinə səbəb nədir?*
*3. Daha hansı şəhərlərimizi tanıyırsınız?*

*28-ci dərs*

# Yollar və körpülər.

**A** Şəhərlərimizi, qəsəbələrimizi, kəndlərimizi bir-biri ilə yollar birləşdirir. Yollar müxtəlif cür olur: torpaq yol, asfalt yol, şose yolu. Belə yollar avtomobillər üçün nəzərdə tutulub. Qatarların da yolları var. Onlara dəmiryolu deyirlər, çünki qatarlar dəmir relslərin üstü ilə hərəkət edir. Yaşayış məntəqələrinin içindəki yollar küçə adlanır. Şəhərlərdəki daha böyük və geniş küçələrə isə prospekt deyirik. Küçələrin, prospektlərin kənarında adamların gediş-gəlişi üçün ayrılmış yollar isə səki adlanır.



Cığır



Asfalt yol



Dəmiryolu



Torpaq yol



Səki

**?**

*1. Asfalt yolla torpaq yolun fərqi nədir?*
*2. Prospektlər hansı yaşayış məntəqələrində olur?*
*3. Hansı yola səki deyirik?*



**B** Yollar bəzən böyük və kiçik çayların, kanalların, dərələrin üstündən keçir. Ona görə də həmin yerlərdə körpülər salırlar. Əgər körpü avtomobillərin keçidi üçündürsə, ona avtomobil körpüsü, qatarların keçidi üçündürsə, dəmiryol körpüsü, yalnız adamların keçidi üçündürsə, piyada körpüsü deyirik. Böyük yolların kəsişdiyi yerlərdə avtomobillərin, qatarların hərəkətinin dayanmaması üçün də körpülər salınır. Belə körpulər şəhərlərin içində də olur.

Azərbaycanda ən uzun körpü Kür çayı üzərindəki avtomobil körpüsüdür. Bu körpü Yevlax şəhərindədir.













**?**

*1. Körpüləri haralarda salırlar?*
*2. Yaşadığınız yerdə hansı körpülər var?*
*3. Azərbaycanda ən uzun avtomobil körpüsü haradadır?*

*29-cu dərs*

# Nəqliyyat vasitələri.

**A** Qədim zamanlardan insanlar bir yerdən başqa yerə getmək, yüklərini daşımaq üçün at, ulaq, dəvə və başqa heyvanlardan istifadə ediblər. Bu məqsədlə müxtəlif arabalar da düzəldiblər. Araba ilə çoxlu yük daşımaq, mənzil başına tez çatmaq olmurdu. İnsanlar yorulur, yükləri xarab olurdu. Ona görə də bilikli insanlar fikirləşib gəmi, avtomobil, qatar, təyyarə icad etdilər. İndi təyyarə ilə ən uzaq yerlərə bir neçə saata getmək olur. Gəmilərə, avtomobillərə, qatarlara, təyyarələrə nəqliyyat vasitələri deyirik.



**?**

1. *Keçmişdə hansı nəqliyyat vasitələrindən istifadə edirdilər?*
2. *Şəhərdəki hansı nəqliyyat vasitələri kənddə yoxdur?*



**B** Nəqliyyatın müxtəlif növləri var: avtomobil nəqliyyatı, dəmiryol nəqliyyatı, su nəqliyyatı, hava nəqliyyatı. Neft kəməri də nəqliyyat növüdür, çünki həmin kəmərlə uzaq yerlərə neft ötürülür. Ölkəmizdə çoxlu neft kəməri var. Onların ən böyüyü qardaş Türkiyəyə çəkilmiş **Bakı—Tbilisi—Ceyhan** kəməridir. Kosmik gəmilər də nəqliyyat vasitəsi hesab olunur. İnsanlar bu gəmilərlə kosmosa uçurlar.



Avtomobil nəqliyyatı



Dəmiryol nəqliyyatı



Su nəqliyyatı



Hava nəqliyyatı

**?**

1. *Hansı nəqliyyat vasitələrini tanıyırsınız?*
2. *Məktəbə gedərkən hansı nəqliyyatdan istifadə edirsiniz?*
3. *Hansı avtomobil markalarını tanıyırsınız?*

## ÇALIŞMALAR

1. Hansı daha əvvəl icad olunub?





2. Hansı yük daşımaq üçündür?






3. Hansı sərnişin gəmisidir?





4. Hansı hava nəqliyyatı **deyil**?







*30-cu dərs*

# Elektrik. Elektrik olmasa, nə baş verər?

**A** Elektrik evlərimizə naqillərlə elektrik stansiyalarından gəlir. Ölkəmizin elektrik stansiyaları Bakıda, Mingəçevirdə, Şəmkirdə, Əli Bayramlıda və Naxçıvandadır. Onların bəziləri su elektrik stansiyaları, bəziləri isə istilik elektrik stansiyalarıdır.

Su elektrik stansiyaları böyük çayların üzərində qurulur və çayın suyu ilə işləyir. İstilik elektrik stansiyaları isə mazut və qazla işləyir. Bundan başqa, insanlar elektrik almaq üçün batareyalar və akkumulyatorlar icad etmişlər. Əl fənərləri, kiçik radiolar, bəzi uşaq oyuncaqları, divar və qol saatları belə batareyalarla işləyir.




**?**

*1. Evlərimizə elektrik haradan gəlir?*
*2. Ölkəmizin elektrik stansiyaları harada yerləşir?*
*3. Akkumulyator nə üçündür?*

**B** İnsanların həyatını elektriksiz təsəvvür etmək olmaz. Elektrik yalnız zavodların, fabriklərin dəzgahlarını işlətmir. Həm də evlərimizi, həyət-bacalarımızı, küçələrimizi işıqlandırır. Elektrik olmasa, evlərimiz işıqsız qalar, elektrik cihazları — televizor, kompyuter, radio, kondisioner, soyuducu işləməz. Çoxmərtəbəli evlərin liftləri dayanar, mənzillərə su gəlməz, beləliklə, insanların yaşayışı çətinləşər.



**?**

*1. Elektrik kəsiləndə evdə nə baş verir?*
*2. Hansı cihazlara elektrik cihazı deyirik?*
*3. Daha hansı elektrik cihazlarını tanıyırsınız?*

**!**

| *Yadda saxlayın* | *Elektrik çox təhlükəlidir!*<br>*Heç vaxt elektrik xətlərinə toxunmayın!*<br>*Yaş əllə işığı yandırıb-söndürməyin!* |
|---|---|



## ÇALIŞMALAR

Elektriki batareyadan alan cihazları batareya ilə, rozetkadan alan cihazları isə rozetka ilə birləşdirin.



*31-ci dərs*

# Bütün peşələr lazımlıdır.

**A** İnsanlar ərzaq almaq üçün satıcının, paltar tikdirmək üçün dərzinin, müalicə olunmaq üçün həkimin, ev tikdirmək üçün bənnanın yanına gedirlər. Teatrda aktyorların, stadionda futbolçuların oyununa tamaşa edirlər. Beləcə, hər bir insan öz ehtiyaclarını ödəmək üçün müxtəlif peşə sahiblərinə müraciət etməli olur. Ona görə də bütün peşələr lazımlıdır. Hər bir insan sevdiyi peşəyə yiyələnməlidir: istər müəllim olmaq istəsin, istər həkim, istər hüquqşünas, istər mühəndis, istərsə də təyyarəçi. Bunun üçünsə yaxşı oxumaq, öyrənmək lazımdır.


Musiqi müəllimi


Hərbçi


Elektrik ustası


Çilingər


Bərbər


Rəngsaz


Dərzi


Traktorçu


Həkim


Qaynaqçı

**?**

1. *Daha hansı peşələri tanıyırsınız?*
2. *Məktəbinizdə hansı peşələrin sahibləri çalışırlar?*
3. *Şəhərdə lazım olan hansı peşələrə kənddə ehtiyac yoxdur?*



**B** İstifadə etdiyimiz şeylərin hər birinin hazırlanmasında nə qədər peşə adamının iştirak etdiyini bilirsinizmi? Misal üçün geydiyimiz pambıq köynəyi götürək.

Traktorçu yazda torpağı şumlayıb malalayır, səpinçi oraya pambıq çiyidi səpir. Çiyidin cücərməsi və inkişafı üçün suçu sahəni suvarır. Mexanizatorlar bitkilərin alağını təmizləyir və payızda qozalar açıldıqdan sonra məhsulu yığıb pambıq zavoduna təhvil verir. Zavodda pambıqdan mahlıc hazırlanıb, əyirici fabrikə göndərilir. Əyiricilər mahlıcdan sap əyirirlər. Başqa fabrikdə sapdan parça toxunur. Parçadan isə dərzi köynək tikir.

Beləliklə, müxtəlif peşə adamları öz zəhmətləri ilə bir ovuc toxumu geydiyimiz köynəyə çevirirlər.



**?**

1. *Paltarın hazırlanmasında hansı peşə adamları zəhmət çəkir?*
2. *Sizin dəri kürkünüzün hazırlanmasında çobanın əməyi nədir?*

## ÇALIŞMALAR

1. Dənizçi papağı hansıdır?





2. «Aləmi bəzər,
   Özü lüt gəzər.» —
tapmacasının cavabı aşağıdakılardan hansıdır?





3. Hansı şəkildəkilər bağban alətləridir?







## *32-ci dərs* Vətənimizin təbii sərvətləri. Yay.*

**A** Azərbaycanda çoxlu neft çıxarılır. Elə ona görə də Vətənimizi hər yerdə «Neft ölkəsi» adlandırırlar. Neft çox qiymətli sərvət olduğundan ona «qara qızıl» da deyirlər. Neftdən alınan yanacaqla avtomobillər, təyyarələr, gəmilər hərəkətə gəlir, istilik elektrik stansiyaları işləyir. Gördüyümüz bütün plastmas əşyalar neft məhsullarından düzəldilir. Yollarımıza döşənən asfaltın hazırlanmasında da neft məhsullarından istifadə olunur. Neftin böyük hissəsi boru, qatar və gəmilərlə başqa ölkələrə göndərilir. Ölkəmizdə qaz, qızıl, gümüş, mis, dəmir və başqa təbii sərvətlər də var.






**?**
*1. Nə üçün Azərbaycanı «Neft ölkəsi» adlandırırlar?*
*2. Nəyə görə neftə «qara qızıl» deyirlər?*
*3. Ölkəmizin daha hansı təbii sərvətləri var?*

**B** Müəllimimiz deyir ki, Vətənimizin ən böyük təbii sərvətləri onun bərəkətli torpaqları, təmiz havası və suyudur. Yurdumuzda hər cür meyvə-tərəvəz yetişdirilir. Ucsuz-bucaqsız tarlalarımızda taxıl, pambıq becərilir. Yaylaqlarımızda, qışlaqlarımızda çoxlu qoyun-quzu, mal-qara saxlanılır. Meşələrimizdə, çöllərimizdə cürbəcür bitkilər bitir, çoxlu heyvanlar və quşlar yaşayır. Doğma Xəzərin sularında qiymətli balıqlar var.

Təbiət bizə öz sərvətlərini təmənnasız verir. Ona görə də **hamımız yurdumuzu sevməli, onun ağaclarını, kollarını, güllərini, çiçəklərini, quşlarını, heyvanlarını qorumalıyıq!**









**?**
*1. Yurdumuzun ən böyük sərvətləri hansılardır?*
*2. Yaşadığınız yerdə hansı bitkilər becərilir?*



**C** Dərs ili sona çatır. Qabaqdan ilin ən isti fəsli olan yay gəlir. İyun, iyul, avqust yay aylarıdır.

Bir neçə gündən sonra bütün şagirdlər yay tətilinə istirahətə çıxacaqlar. Vətənimizin çoxlu gözəl istirahət yerləri var. Sinif yoldaşlarımın bəziləri tətillərini Nabranda, bəziləri Altıağacda keçirəcəklər. Kənddə yaşayan qohumlarının yanına getmək istəyənlər də var.

Mən tətilimi bacımla birlikdə Hacıkənddə əmimgildə keçirəcəyəm. Təbiətin qoynunda dincəlib, təmiz hava almaqdan, sərin bulaq suyu içməkdən, çiçəklərin ətrini duymaqdan gözəl nə ola bilər!








**!** ***Yadda saxlayın***
*Tanımadığınız bitkilərin meyvələrini yeməyin!*
*Tanımadığınız cücülərə toxunmayın!*

## MÜNDƏRİCAT




**HƏYAT BİLGİSİ**

*Ümumtəhsil məktəblərinin 1-ci sinfi üçün*

Bəzi rəsmlərin müəllifi ***C.Dərbəndidir.***

Çapa imzalanıb: 10.08.2006. Formatı 60×84 $^{1}/_{8}$. Ofset kağızı № 1.

**«Osmanlı Yayınları»** Nəşriyyat Evi.
AZ1009. Bakı, S.Rəhimov küç., 108.

